"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ
# ŞAMAXI FİLİALI - 30



H.Əliyev
"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN ŞAMAXI FİLİALI




## AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN ŞAMAXI FİLİALI - 30






ADPU-NUN REKTORU PROFESSOR CƏFƏR CƏFƏROVUN TƏBRİKİ

səh. 2



FİLİAL KOLLEKTİVİNİN TƏBRİK MESAJLARI

səh. 4-7



ŞAMAXI RAYON İCRA HAKİMİYYƏTİNİN BAŞÇISI CƏNAB TAHİR MƏMMƏDOV FİLİALIN 30 İLLİK YUBİLEYİ İLƏ BAĞLI TƏBRİKİ

səh. 3



ADPU ŞAMAXI - 30 ŞƏKİLLƏRDƏ

səh. 7



DÜNƏNDƏN BU GÜNƏ: ADPU-NUN ŞAMAXI FİLİALI

səh. 3-4



GƏNCLİYİMİZ GƏLƏCƏYİMİZ

səh. 8

*1921-ci ildən təhsilimizin keşiyində...*

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | Yubiley buraxılışı, 2022 / № 12 (1115)

# ADPU-NUN ŞAMAXI FİLİALI - 30 / TƏBRİKLƏR

## AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN REKTORU PROFESSOR CƏFƏR CƏFƏROVUN TƏBRİKİ



"Azərbaycan Dövlət Pedaqoji Universiteti müəllim hazırlığı sahəsində və pedaqoji təhsilin inkişafı naminə bu gün də uğurlu fəaliyyəti ilə müstəqil Azərbaycanın inkişafına töhfələrini əsirgəmir. Universitetdə qabaqcıl elmi nailiyyətlərdən, innovativ təlim-tədris texnologiyalarından faydalanmaqla ali təhsilin məzmun və keyfiyyət göstəricilərinin təkmilləşdirilməsi istiqamətində zəruri addımlar atılır", – cənab Prezidentin bu fikirləri son illər sürətli inkişaf yolunda inamla irəliləyən Azərbaycan Dövlət Pedaqoji Universitetin fəaliyyətinə verilən ən ali qiymətdir. Bununla belə, təbii ki, həyat yerində durmur. Dünənki uğurlarımız gələcəyə atılan addımlarımızın möhkəm təməli, bugünkü nəticələrimiz sabahkı yol xəritəmizin kontur cizgiləridir. İndi ərazi bütövlüyünü bərpa etmiş Azərbaycan Respublikası inkişafının yeni mərhələsinə qədəm qoymuşdur. Bu isə bizim də qarşımızda daha məsul vəzifələr qoyur. Rəqabətədavamlı insan kapitalının formalaşdırılmasında müasir təhsil-tərbiyə texnologiyasına əsaslanmaqla yeni düşüncəyə, əxlaqi və mənəvi saflığa, yüksək peşə və ixtisas bacarıqlarına malik müəllim kadrlarının hazırlığı, onların vətənpərvər və dövlətçiliyə sədaqət ruhunda tərbiyəsi Pedaqoji Universitetin professor-müəllim kollektivinin əsas hədəfidir. Bu sahədə bölgələrimizdə yerləşən ali təhsil ocaqlarımızın – filialların da əməyi danılmazdır. Bu gün bizim hamımızı müqəddəs dəyərlərilə ülvi şəkildə birləşdirən zəngin ənənələrə malik təhsil və elm məbədi - Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyi ilə yanaşı, regionda böyük nüfuza malik, özünəməxsus ənənələri olan Pedaqoji Universitetin Şamaxıfilialının 30 illik yubileyini qeyd etmək hər birimizdə böyük qürur hissi doğurur. Çoxsaylı kollektivimiz, eləcə də respublikamızın geniş pedaqoji ictimaiyyəti üçün əziz olan bu möhtəşəm yubileylər münasibətilə indiyədək həyat və fəaliyyətini ADPU ilə, Şamaxı filialı ilə bağlamış professor-müəllim heyətini, əməkdaşlarımızı, tələbələrimizi və sədası Vətənimizin müxtəlif guşələrindən, habelə dünyanın uzaq məkanlardan gələn doğma təhsil ocağının hər bir yetirməsini, ölkədəki bütün həmkarlarımızı səmimi qəlbdən bir daha təbrik edirəm!



## ŞAMAXI RAYON İCRA HAKİMİYYƏTİNİN BAŞÇISI CƏNAB TAHİR MƏMMƏDOVUN AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN ŞAMAXI FİLİALININ KOLLEKTİVİNƏ FİLİALIN 30 İLLİK YUBİLEYİ MÜNASİBƏTİLƏ TƏBRİKİ



Azərbaycan Respublikası hazırda Zəfər tarixindən sonra qədəm qoyduğu yeni inkişaf mərhələsini yaşayır. Qədim tarixi və zəngin mədəniyyəti olan xalq, Şərq və Qərb sivilizasiyalarının qovuşduğu coğrafi və strateji geosiyasi məkana malik ölkə, hüquqi-demokratik, dünyəvi dövlət kimi yeni əsrə daxil olan Azərbaycan 2021-ci ilin oktyabrında müstəqilliyimizin bərpasının otuzuncu ildönümünü böyük təntənə ilə qeyd etdi. Ötən əsrlərdə vətənimizin keçdiyi tarixi yola yekun vuruldu, yeni əsrdə müstəqil Azərbaycanın ictimai-siyasi, mədəni həyatının inkişaf strategiyasının istiqamətləri bir daha dünyaya bəyan edildi. Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin hələ müstəqilliyin onuncu ildönümünə həsr olunmuş təntənəli tədbirdə qeyd etdiyi kimi Azərbaycanda xalq inkişaf edib, savadsızlıq tamamilə ləğv olunub, ali təhsil ocaqları, universitetlər, elmi müəssisələr yaranıb, böyük sənaye və iqtisadi potensial formalaşıb, mədəniyyət, ədəbiyyat və incəsənətimiz sürətlə inkişaf edib. Bunlar da bizim müstəqil dövlətimiz üçün böyük iqtisadi, sosial, elmi potensial yaradıb.

Məhz bu ideyalar işığında bu gün öz təhsili, mədəniyyəti və iqtisadiyyatı sahəsində günü-gündən inkişaf edən Şamaxı Ulu Öndərin dövlətçilik və təhsil nəzəriyyəsinə sadiq qalır. Azərbaycanın elm, təhsil, səhiyyə, mədəniyyət sahəsində misilsiz xidmətləri ilə tariximizə adı qızıl hərflərlə yazılmış bu şəhər, ölkəmizə Əfzələddin Xaqani, İmadəddin Nəsimi, Fələki Şirvani, Seyid Əzim Şirvani, Mirzə Ələkbər Sabir, Sultan Məcid Qənizadə, Abbas Səhhət, Məhəmməd Hadi, Camo Cəbrayılbəyli, Həbib bəy Mahmudbəyov və s. bu kimi maarifçi, tərəqqipərvər dahilər bəxş etmişdir. Tarixin müxtəlif dövrlərində Azərbaycanın inkişaf etmiş mərkəzi şəhərlərindən biri olmuş Şamaxı hazırda möhtərəm Prezident cənab İlham Əliyevin, Birinci vitse-prezident xanım Mehriban Əliyevanın diqqət və qayğısı ilə sürətlə inkişaf etməkdədir. Şamaxı rayonunda son illərdə həyata keçirilən layihələr rayonun dinamik inkişafını təmin edir.

Bütün bu inkişaf təhsil sahəsindən də yan keçməmişdir. Son dövrlərdə Şamaxı təhsilində sürətli yenilənmə, keyfiyyət dəyişiklikləri, məktəblərin, digər təhsil ocaqlarının maddi-texniki bazalarının zənginləşdirilməsi prosesi daha da gücləndirilmişdir. Bilirik ki, təhsilin inkişafı hər bir ölkədə inkişaf konsepsiyasının mühüm tərkib hissəsidir. Prezident cənab İlham Əliyevin təhsilin inkişafına göstərdiyi diqqət və qayğı bir daha onu təsdiqləyir ki, bu mühüm amil dövlət siyasətinin strateji istiqamətlərindən biri və bəlkə də ən başlıcasıdır. Bu baxımdan Heydər Əliyev Fondunun həyata keçirdiyi "Yeniləşən Azərbaycana yeni məktəb" layihəsi çərçivəsində son illər ərzində Şamaxıda onlarla yeni məktəb binası inşa edilmiş və əsaslı təmir olunmuşdur. Bu da Şamaxıda təhsil keyfiyyətinin yüksəlməsinə, əlverişli təhsil mühitinin yaranmasına gətirib çıxarmışdır. Bu gün Şamaxıda 67 ümumtəhsil məktəbi ilə yanaşı, Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şamaxı filialı, Dövlət Regional Kolleci, Milli Elmlər Akademiyasının Şamaxı Astrofizika Rəsədxanası fəaliyyət göstərir. Ölkəmizin ali təhsil sistemində xüsusi yeri və mövqeyi olan Azərbaycan Dövlət Pedaqoji Universitetinin yaradılmasının 100 ili tamam oldu. Qeyd olunmalıdır ki, Azərbaycan Dövlət Pedaqoji Universiteti fəaliyyəti boyunca Azərbaycanda kadr hazırlığı prosesinə töhfələr vermiş, yetişdirdiyi minlərlə maarifçi və ictimai xadim Azərbaycan cəmiyyətinin inkişafında mühüm rol oynamışdır. ADPU ölkəmizdə müəllim hazırlığının mərkəzi hesab edilir. Hazırda universitet və onun respublikanın ayrı-ayrı bölgələrində fəaliyyət göstərən 5 filialı öz şərəfli və müqəddəs missiyasını uğurla yerinə yetirir.

Bu bir həqiqətdir ki, ADPU-nun Şamaxı filialı Şamaxının ictimai-siyasi həyatında aparıcı yerlərdən birini tutur, dövlət siyasətinə dəstək olması və bu sahədə maarifləndirmə işinin həyata keçirilməsində fəal mövqe tutması ilə diqqəti cəlb edir. Cəmiyyətimizdə özünə hərtərəfli müsbət imic qazanmış filialın yetişdirdiyi tələbə-gənclər nəinki rayonun, həmçinin regionun ictimai həyatında, könüllülük fəaliyyətlərində xüsusi fərqlənirlər. İstər tələbələr, istərsə də məzunlar fəaliyyət göstərdikləri bütün müəssisələrdə, iştirakçısı olduqları hər bir tədbirdə filialı layiqincə təmsil edirlər. Onun məzunları nəinki respublikanın müxtəlif ali məktəblərində, elmi-tədqiqat institutlarında, orta ixtisas, orta ümumtəhsil və məktəbəqədər təhsil müəssisələrində, həmçinin dövlət idarəçiliyinin ayrı-ayrı sahələrində uğurla fəaliyyət göstərirlər.

Dəfələrlə şəxsən filialda olub, bu səmimi və çalışqan kollektivlə görüşmüşəm. Düşünürəm ki, hazırda regionda yeganə ali təhsil müəssisəsi olan ADPU-nun Şamaxı filialında maddi-texniki bazanın möhkəmləndirilməsi, ali pedaqoji təhsilin məzmun və formasının təkmilləşdirilməsi, professor-müəllim heyəti və tələbə kollektivi arasında mənəvi-psixoloji mühitin sağlamlaşdırılması istiqamətində əməli tədbirlər uğurla həyata keçirilir. Respublikamızda müəllim kadrlarının hazırlanmasında mühüm rolu olan ADPU-nun Şamaxı filialının kollektivini filialın yaradılmasının 30 illik yubileyi münasibətilə təbrik edir, onlara fəaliyyətlərində uğurlar arzulayıram!

# DAĞLIQ ŞİRVAN BÖLGƏSİNİN YEGANƏ ALİ TƏHSİL OCAĞI

## ADPU- NUN ŞAMAXI FİLİALININ DİREKTORU DOSENT TÜNZALƏ YUSİFOVA

Qələbə sevinci yaşadığımız bu illər bizim üçün bir də ona görə əlamətdar oldu ki, biz ölkəmizdə elmi pedaqoji fikrin, maarifin və milli mədəniyyətin inkişafını öz çiyinlərində daşıyan Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyini qeyd etdik, bu günlərdə isə onun Şamaxı filialının 30 illik yubileyini qeyd edirik.

XX əsrin sonlarında müstəqillik qazanan Azərbaycan Respublikası iqtisadi, sosial, mədəni inkişafı üçün dövlət səviyyəsində siyasətini müəyyənləşdirdi və təhsilə xüsusi önəm verdi. Ulu öndərimiz Heydər Əliyev təhsili millətin gələcəyi kimi qiymətləndirirərək deyirdi: "Təhsil sahəsi müqəddəs bir sahədir. Çünki təhsil sahəsi uşaqları, gəncləri hazırlayıb gələcəyə əsl vətəndaş, yüksək səviyyəli mütəxəssis etmək üçün mövcuddur". Gənc nəsillərin öyrədilməsi, maarifləndirilməsi ən qədim fəaliyyətlərdəndir. Gənc nəsli öyrədəcək kadrların yetişdirilməsi isə daha çox diqqət tələb edən sahələrdəndir. Elə bu yöndən, hörmətli rektorumuz, professor Cəfər Cəfərov filialların 30 illik yubileyinin qeyd edilməsi ilə bağlı əmr imzalamaqla, bölgələrdə filialların fəaliyyətinin nə qədər əhəmiyyətli olduğunu bir daha diqqətə çatdırdı. Şamaxı filialı fəaliyyəti dövründə böyük inkişaf yolu keçmişdir. Bu gün 30 illik



yubileyini qeyd edən filial ölkənin və regionun sosial-iqtisadi inkişafının tələblərinə uyğun bilik və bacarığa malik mütəxəssislər yetişdirmək və filialı daimi təhsil-tədqiqat-innovasiya mərkəzinə çevirmək yolunda öz işini uğurla davam etdirir. Şamaxı filialının idarə olunması, ona rəhbərlik və nəzarətin həyata keçirilməsi dövlətin təhsil sahəsində irəli sürdüyü prinsiplərə uyğun qurulur. Filialın demokratiklik və şəffaflıq prinsipləri ilə idarə olunmasını təmin etmək məqsədilə müəssisədə idarə və özünüidarə orqanları fəaliyyət göstərir. Filialın 17 nəfər professor və müəllim heyətindən ibarət Elmi Şurası kollegial idarə orqanıdır və filiala ümumi rəhbərlik bu Şura tərəfindən həyata keçirilir. Filial respublikanın və eləcə də, bir neçə xarici ölkənin nüfuzlu ali təhsil müəssisələri və təşkilatları ilə əməkdaşlıq edir.

Filialda fəaliyyət göstərən kafedraların missiyası təsilalanlara pedaqoji sahədə ən yaxşı təhsil və biliklər vermək, rəqabətə davamlı təhsil bazası yaratmaq və gələcəyin müəllimlərini günün tələblərinə uyğun yetişdirməkdir. Professor-müəllim heyətinin və tələbələrin filialdan kənarda keçirilən elmi seminarlar, konfranslar, treninqlərdə iştirak etməsi, əməkdaşlıq edilən digər təhsil müəssisələri və təşkilatlarla birgə tədbirlərin təşkil edilməsi, əməkdaşların elmi tədqiqat işlərinin tədris prosesinə tətbiqi və eləcə də Tələbə Elmi Cəmiyyəti xətti ilə tələbələrin tədqiqatçılıq bacarıqlarının artırılması da kafedraların iş planına daxildir.

Bir təhsil müəssisəsi olaraq təhsilverənlərin fəaliyyətinin qiymətləndirilməsinə və təhsilalanların bilik və bacarıqlarının səviyyəsinə nəzarət daim diqqət mərkəzindədir. Bunun üçün filialda Keyfiyyət təminatı şöbəsi fəaliyyət göstərir.

ARDI 4-CÜ SƏHİFƏDƏ

Filialda fəaliyyət göstərən "Karyera mərkəzi"-nin yaradılmasında məqsəd tələbələrin intellektual, mədəni inkişafı, peşəkarlıq hazırlığı səviyyəsinin yüksəldilməsi ilə yanaşı, məşğulluq problemlərinin həll edilməsi üzrə maarifləndirici tədbirlərin həyata keçirilməsidir. Mərkəz məzunlar haqqında yaradılmış elektron məlumat bazasını da daim yeniləyir. 30 il ərzində filialda 3 minə yaxın ali təhsilli pedaqoji kadr hazırlanmışdır.



## MÖTƏBƏR TƏDBİRLƏR

Yarandığı illərdən filialda keçirilən elmi konfransların davamı olaraq, son illərdə də beynəlxalq və respublika səviyyəli elmi konfransların, seminarların keçirilməsi tədris prosesinin bir hissəsi kimi özünü göstərir. III Beynəlxalq Həmzə Nigari Türk Dünyası Mədəni İrsi Simpoziumunun keçirilməsi və davamı olaraq Türkiyə Cümhuriyyəti Amasya Universitetində keçirilmiş IV Simpoziumunda filialın əməkdaşlarinin iştirakı, "Müəllim, məni yaradıcılığa ruhlandır!" mövzusunda pedaqoji oxular, "Türkdilli xalqların elmi-mədəni əlaqələri müasir mərhələdə: tarixi ənənə və perspektivlər" mövzusunda Respublika elmi konfransı, "V Beynəlxalq elm və təhsildə innovativ texnologiyalar konfransı" və "Mirzə Ələkbər Sabir: Tarixi yaddaş və müsirlik" Respublika elmi konfransı və bu kimi digər tədbirlərin keçirilməsi müsbət hal kimi qiymətləndirilə bilər.

Filial həmçinin respublikanın və eləcə də bir çox xarici ölkələrin nüfuzlu ali təhsil müəssisələri və təşkilatları əməkdaşlıq edir.

Bundan əlavə son 5 ildə filial 2019- cu ildə Azərbaycan Respublikası Mədəniyyət Nazirliyinin Mədəniyyət üzrə Elmi-Metodiki və İxtisasartırma Mərkəzi, İsmayıllı İntellektual Oyunlar Klubu və Quba soyqırım memorial kompleksi ilə qarşılıqlı anlaşma memorandumu imzalamaqla fəaliyyət dairəsini daha da genişləndirmişdir.



**Müasir standartlara cavab verən infrastruktur**

Son illərdə filialın tədris korpusunda təmir işləri aparılmış, infrastruktur və maddi-texniki bazası xeyli yaxşılaşdırılmışdır. Tədris binası 3 mərtəbədən ibarətdir. Binada 25 tədris auditoriyası, 16 xidməti otaq, tibb otağı, 2 oxu zalı və 3 kitabxana fondu, 100 nəfərlik yeməkxana, 150 nəfərlik akt zalı, 50 nəfərlik Heydər Əliyev Lektoriyası və İnklüziv təhsil laboratoriyası mövcuddur. Mövcud 25 auditoriyanın hər biri müasir standartlara cavab verən texniki avadanlıqlarla təchiz olunmuşdur. Belə ki, onların hər birində kompüter, 4 otaqda elektron lövhə, 6 otaqda proyektor yerləşdirilmişdir. Filialın güclü süratli fiberoptik internetə qoşulması internetlə bağlı olan bütün problemləri aradan qaldırmışdır. Filialda internet və lokal şəbəkə fəaliyyət göstərir. Filialın rəsmi internet saytı daim fəaliyyətdədir. Bundan başqa filialda Azərbaycan Təhsil İnformasiya Sisteminin fəaliyyəti üçün də süratli internetlə təchiz olunmuş otaq fəaliyyət göstərir. İKT-nin multimedia və internet imkanlarının zənginləşdirilməsi və onlardan səmərəli istifadənin təşkili, elektron dərslik, dərs vəsaitlərinin hazırlanması həyata keçirilir, təcrübə mübadiləsinin və qabaqcıl təcrübənin yayılması məqsədilə kafedralar tərəfindən açıq dərslər və onların müzakirəsi təşkil edilir, filial əməkdaşlarının müxtəlif təlim kursları və seminarlarda iştirakı təmin olunur. Tədrisin keyfiyyətini daha da artırmaq məqsədilə ixtisaslara uyğun olaraq tarix, coğrafiya, riyaziyyat, informatika, ədəbiyyat kimi müxtəlif fənn kabinetlərindən istifadə olunur.

## QOŞULDUĞU LAYİHƏLƏR

ADPU-nun Şamaxı filialı təhsil sahəsində aparılan islahatlara qoşulmağı hədəf olaraq müəyyən etmişdir. 2019-cu ildən Regional İnkişaf İctimai Birliyinin "Müəllimlərin inklüziv təhsil sahəsində bacarıqlarının artırılması" layihəsi çərçivəsində İnklüziv Təhsil Mərkəzi fəaliyyətə başlamışdır. Mərkəzdə layihə çərçivəsində təlim və seminarlar keçirilmişdir. Hazırkı dövrədək mərkəzdə filialın bütün professor-müəllim heyəti, buraxılış ili tələbələri, Şamaxı rayon və kəndlərindən 50 nəfər məktəb direktoru maarifləndirici təlimlərdən, 225 nəfər ibtidai sinif müəllimi isə ixtisasartırma təlimlərindən və 100-dən artıq valideyn maarifləndirici seminarlardan keçmişdir. 2017-ci ildən başlayaraq UNICEF və Avropa İttifaqının maliyyə dəstəyi, Azərbaycan Respublikası Təhsil Nazirliyinin dəstəyi ilə Azərbaycan Respublikasının Təhsil İnstitutu (ARTİ) tərəfindən icra edilən "İcma əsaslı məktəbəqədər təhsil" layihəsinə də qoşulan filial bu sahədə də qarşıya qoyulan vəzifələri uğurla yerinə yetirir. Xüsusi vurğulanmalıdır ki, bu layihə regionların inkişafı sahəsində aparılan dövlət siyasətinə dəstək göstərilməsinə xidmət edir.




Ötən ildə filialda tədris ilində yeni icma əsaslı məktəbəqədər təhsil qruplarında çalışacaq və eləcə də artıq bir neçə ildir işləyən bir qrup tərbiyəçi müəllimlər üçün "Erkən yaşda uşaq inkişafı sahəsində bilik və bacarıqların artırılması məqsədilə 108 saatlıq pedaqoji kurslar" təşkil edilmişdi. Filalın təhsil yolunda göstərdiyi fədakar fəaliyyətini nəzərə alaraq qeyd edə bilərik ki, kollektivimiz möhtərəm Prezidentimiz İlham Əliyevin Azərbaycan təhsilinə diqqət və qayğısına cavab olaraq elmdə və təhsildə daha böyük uğurlar qazanmaq üçün elmi-pedaqoji axtarışlarını davam etdirməyi, Ulu Öndərimizin siyasi və sosial proqramlarını həyata keçirilməsində əzmkarlıqla çalışan I vitse-prezident Mehriban xanım Əliyevanın təhsillə bağlı bütün çağırışlarına inamla qoşulraq, yüksək peşə və ixtisas hazırlığına malik pedqoji kadrlar hazırlamaq işini bundan sonra da davam etdirməyi qarşıya məqsəd qoyur.

# FİLİALI İRƏLİYƏ APARANLAR



1991-ci ilin iyul ayında yaradılan Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şamaxı filialında Təhsil nazirliyinin sərəncamı ilə tarix, Azərbaycan dili və ədəbiyyatı, riyaziyyat , ibtidai təhsilin pedaqogikası və metodikası, pedaqogika və psixologiya (məktəbəqədər) ixtisasları üzrə qiyabi şöbəyə tələbə qəbulu keçirildi. ADPU-nun pedaqoji kollektivinin yaxından köməkliyi ilə filialın maddi texniki bazası zaman - zaman möhkəmləndirildi, xeyli texniki avadanlıq, dərslik, dərs vəsaitləri, ümmiyyətlə 25 min nüsxə kitab və digər avadanlıqlar alındı. Mühazirə və seminar məşğələlərini aparmaq üçün Pedaqoji Universitetdən, Bakı Dövlət Universitetindən, Milli Elmlər Akademiyasından və digər ali məktəblərdən yüksək xtisaslı mütəxəssislər dəvət olundu.Yerli mütəxəssislərin hesabına yüksək ixtisaslı kadrlar hazırlandı. Belə ki, 1991-2000-ci illərdə filialda 15 nəfər namizədlik və doktorluq dissertasiyalarını uğurla müdafiə etdi. Keçən bu müddət ərzində filialımız yüksək ixtisaslı pedaqoji mütəxəssislərin hazırlanmasında mühüm rol oynamışdır. Bütün sahələrdə bu günə qədər öz təmiz və ülvi adını qoruyub saxlayan qoca Şirvanı həmişə ləyaqətlə təmsil edən filialın əməkdaşları yeni düşüncə və təfəkkürə, yüksək mənəvi saflığa malik vətənpərvər, xalqımıza və dövlətimizə sadiq olan müəllim kadrları yetişdirməyə çalışırlar. Bu 30 ildə çətin və mürəkkəb yol keçən filialın pedaqoji kollektivi ADPU-nun şərəfli ənənəsinə həmişə sadiq qalmış, yüksək ixtisaslı pedaqoji kadrların hazırlanmasında var qüvvəsilə çalışmışdır. Şirvan bölgəsində yeganə ali məktəb olan Şamaxı filialı bu gün də müəllim hazırlığı sahəsində, habelə bir sıra beynəlxalq tədbirlərin həyata keçirilməsində və təhsilimizin inkişafı istiqamətindəöz ənənəvi missiyasını ləyaqətlə yerinə yetirir.

Filialda əsası Ümumilli lider Heydər Əliyev tərəfindən qoyulan gənclər siyasəti uğurla həyata keçirilir. Pedaqoji kollektivimiz tələbələrin milli vətənpərvərlik, mədəniyyətimizə, adət ənənələrimizə hörmət ruhunda tərbiyə olunmasında, gənclərin fiziki cəhətdən sağlam ruhda böyüməsinə xüsusi diqqət yetirirlər. Hörmətli Tünzalə xanım, Sizi və rəhbərliyiniz dövründə günü-gündən inkişaf edən Şamaxı filialının professor-müəllim və tələbə heyətinin30 illik yubiley münasibətilə səmimi qəlbdən təbrik edirik. İnanıram ki, filialın direktoru dos. Tünzalə xanım Vəliyeva başda olmaqla bütün pedaqoji kollektiv bundan sonra da var qüvvəsilə çalışaraq təhsilin və elmin inkişafına öz töhfəsini verəcəkdir .

**Sosial və pedaqoji elmlər kafedrasının müdiri dosent Mayıl Alıcanov**



Şamaxının keçmişinə, Azərbaycan tarixindəki yerinə və roluna son dərəcə hörmətlə, ehtiramla yanaşan Ulu Öndər Heydər Əliyevin "Şamaxı Azərbaycanın ən qədim elm və mədəniyyət mərkəzidir" kəlamı 1000 ildən artıq böyük

ARDI 5-Cİ SƏHİFƏDƏ

Şirvanşahlar dövlətinin paytaxtı olmuş Şamaxı şəhərinə verilmiş ən yüksək qiymətdir. Elm, mədəniyyət mərkəzi, maarif, poeziya, sənət beşiyi olan, orta əsrlərdə "Darül – ədəb" – ədəb universiteti, ariflər yurdu adlanan Şamaxı şəhərində 1991-ci ildə pedaqoji kadr hazırlayan qocaman ali təhsil müəssəsinin – Azərbaycan Dövlət Pedaqoji Universitetinin filialının açılması təsadüfi hadisə deyil, tarixi varislik baxımından Heydər Əliyev dühasının təntənəsidir. Məqsəd respublikamızda, o cümlədən Şirvan bölgəsində ali təhsilli, yüksək ixtisaslı pedaqoji kadrlara olan tələbatı ödəmək idi. 30 ildən artıq bir dövrdə Şamaxı filialının pedaqoji kollektivi qarşıya qoyulan bu şərəfli missiyanı uğurla davam etdirmişdir.

Rəhbərlik etdiyim Tədris şöbəsi filialda tədrisin keyfiyyətinin yüksəldilməsi, yeni pedaqoji innovasiyaların tədris prosesinə tətbiqi sahəsində öz işini günün tələbələri səviyyəsində qurmağa çalışır.Şöbə filialın kafedralarında tədris işlərini təşkil edir, tədris yüklərinə dair tapşırıqların müvafiq strukturlara çatdırılmasını, kafedralar üzrə professor-müəllim heyətinin dərs yükünün yerinə yetirilməsini, tədrislə bağlı bütün statistik məlumatların hazırlanması və aidiyyəti yerlərə göndərilməsini təşkil edir. Şöbə eyni zamanda tədris prosesinin təkmilləşməsinə xidmət edən təkliflər, metodik göstərişlər, tövsiyələr hazırlayır, açıq dərslərin keçirilməsini təşkil edir, tədris olunan fənlərin proqramlarının mövcudluğu vəziyyətini öyrənir.

Tədris şöbəsinin Pedaqoji təcrübə və məzunlarla iş bölməsi tələbələrin tədris bacarıqlarını pedaqoji təcrübədə nümayiş etdirmələrinə, məzunların karyera imkanlarının artırılmasına bilavasitə rəhbərlik edir. Təsadüfi deyildir ki, bu gün filialın 3000 minə yaxın məzunu respublikamızın ictimai-siyasi və mədəni həyatında fəal rol oynamaqla Azərbaycan dövlətinə, dövlətçiliyə layiqincə xidmət edirlər.

Yeni-yeni uğurlar, yubileylər və müstəqil ali təhsil müəssisəsi kimi fəaliyyət göstərməsi arzusu ilə bu müqəddəs təhsil ocağının – Şamaxı filialının bütün əməkdaşlarını təbrik edir, şərəfli işlərində uğurlar arzulayıram.

**Tədris şöbəsinin müdiri:**
**Fəxrəddin Emin oğlu Məmmədov.**



Qədim köklərə malik torpaqda yaradılmış, müqəddəs dəyərləri, bəşəri ideyaları, milli xüsusiyyətləri elmi baxışlar ilə ülvi şəkildə birləşdirən və zəngin ənənələrə malik təhsil məbədi olan Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şamaxı filialının 30 illik yubileyini qeyd etmək hər birimizdə böyük qürur hissi doğurur.

30 illik tarixə malik olan Şamaxı filialında görülən hər bir uğurlu fəaliyyət bu günümüzün, sabahımızın, gələcəyimizin uğurudur. Filialın qarşısında duran əsas məqsəd ölkənin və regionun sosial-iqtisadi inkişafının tə-ləblərinə uyğun bilik və bacarığa malik mütəxəssislər yetiş-dir-mək və filialı təhsil-tədqiqat-innovasiya mərkəzinə çevirməkdir.Hazırda filialda bakalavr təhsil pilləsində kadr hazırlığı aparılan Pedaqoji fakültədə 7 ixtisas üzrə "İbtidai sinif müəllimliyi", "Tarix və coğrafiya müəllimliyi", "Riyaziyyat və informatika müəllimliyi", "Azərbaycan dili və ədəbiyyat müəllimliyi", "Təhsildə sosial psixoloji xidmət", "Məktəbəqədər təlim və tərbiyə" və "Məktəbəqədər təhsil" ixtisaslarında 600-ə yaxın tələbə təhsil alır.

Pedaqoji fakültənin nəzdində fəaliyyət göstərən 3 kafedrada - Dil-ədəbiyyat və onların tədrisi texnologiyaları, Riyaziyyat və kompüter elmləri, Sosial və pedaqoji elmlər kafedrasında36 nəfər professor-müəllim heyəti fəaliyyət göstərir.

Dəyərli kollektivimiz, respublikamızın geniş pedaqoji ictimaiyyəti üçün də əlamətdar hadisə olan 30 illik yubiley münasibətilə sizi, tələbələrimizi və sədası Vətənimizin müxtəlif guşələrindən gələn doğma təhsil ocağımızın hər bir yetirməsini ürəkdən təbrik edir, bu müqəddəs və şərəfli yolda uğurlar arzulayıram.

**Pedaqoji fakültə dekanı, baş müəllim Qahirə Şahbazova**



Dövlətçiliyimizin, elm, təhsil və mədəniyyətimizin tarixi ənənələrini qoruyub saxlayan Şamaxı müstəqilliyimizin qazanılmasından sonra yeni inkişaf mərhələsinə qədəm qoydu. ADPU-nun Şamaxı filialı müstəqilliyimizin bəhrəsi kimi meydana gəlmişdir. Milli intibahın təminatında başlıca vasitə olan elm və təhsil bir çox problemlərin həllində mühüm rol oynayır. Öz tarixi missiyasına görə cəmiyyət həyatında vacib faktor olan milli təhsil məsələsi Heydər Əliyevin siyasi hakimiyyəti dövründə həmişə diqqət mərkəzində olub. Dünyəvi təhsilə inteqrasiya yolunu seçən Ümummilli lider Heydər Əliyevin ideyaları onun layiqli siyasi varisi olan İlham Əliyev tərəfindən uğurla davam etdirilir. ADPU-nun Şamaxıfilialının təsis olunması bölgədə yüksək ixtisaslı pedaqoji kadrlara olan ehtiyacın ödənilməsi üçün tarixi şərait yaratdı. Ötən otuz il ərzində müxtəlif ixtisaslar üzrə kadr hazırlığı həyata keçirən filialda elmi-pedaqoji keyfiyyəti ilə seçilən güclü professor-müllim heyəti çalışır.Dil-ədəbiyyat və onların tədrisi texnologiyası kafedrasının əməkdaşları pedaqoji kadr hazırlığı ilə yanaşı, dərslik, dərs vəsaitləri, monoqrafiya və proqram hazırlığı sahəsində də uğurla çalışır. Respublikanın qabaqcıl ali təhsil müəssisələrinin müvafiq kafedraları ilə əməkdaşlıq edilir, beynəlxalq, respublika səviyyəli elmi-praktik konfranslarda təmsil olunurlar.

ADPU-nun yüz,filialın otuz illik yubileyi münasibətilə hər kəsi ürəkdən təbrik edir, yeni-yeni uğurlar arzulayıram.

**Dil-ədəbiyyat və onların tədrisi texnologiyası kafedrası-nın müdiri f.ü.f.d. Eyvaz Məhəmmədəli oğlu Eminalıyev**



Əsası ulu öndərimiz Heydər Əliyev tərəfindən qoyulmuş müstəqil Azərbaycan bu gün dünya birliyinə inteqrasiya istiqamətində çox ciddi addımlar atmış ən qabaqcıl ölkələrdən biri kimi tanınmış, iqtisadi inkişaf tempinə görə lider ölkələr sırasında dayanmışdır. Uğurla aparılan daxili və xarici siyasətin nəticəsidir ki, ölkəmizin nüfuzu bütün dünyada artmaqdadır.Bu gün Azərbaycan təhsili də dünya təhsilinə inteqrasiya edir.

Müstəqil Azərbaycan Respublikasında təhsilin strateji hədəfləri sırasında insan kapitalının inkişafına şərait yaradan səriştəli təhsilverənlərə, ən yeni texnologiyalara əsaslanan infrastruktura malik, keyfiyyət səviyyəsinə görə dünyada öncül mövqe tutan təhsil sisteminin, o cümlədən ali təhsilin formalaşdırılması ön planda durur. Bu baxımdan respublikamızın dilbər guşələrindən biri olan Şamaxı şəhərində yerləşən ilk ali təhsil müəssisəsinin, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı filialının fəaliyyət göstərməsini təqdirəlayiq hal kimi qiymətləndirmək olar. ADPU-nun Şamaxı filialı olaraq məqsədimiz tələbələrimizə pedaqoji sahədə ən yaxşı təhsil və ən müasir bilikləri vermək, məzunlarımızın həm ölkə daxilində, həm də beynəlxalq səviyyədə olan karyera imkanlarından faydalanmaları üçün lazımi şərait yaratmaqdır.

Riyaziyyat və kompüter elmləri kafedrası filialın aparıcı kafedralarından biridir. Kafedrada təhsilin keyfiyyətini və müasirliyini bərpa etmək məqsədilə mütəmadi olaraq monitorinqlər keçirilir. Monitorinqin nəticələri araşdırılır və müzakirə olunaraq müvafiq tədbirlər görülür. Kafedra müasir təhsil sisteminin tələblərinə uyğun yüksək ixtisaslı mütəxəssislərin hazırlanması prosesində riyaziyyat və informatika elmlərinin müxtəlif sahələrini əhatə edən 57-dən çox fənnin tədrisini həyata keçirir. Filialın bütün elmi-tədris strukturları kimi Riyaziyyat və kompüter elmləri kafedrası da öz fəaliyyətini iki istiqamətdə – elmin inkişafı və tədris prosesinin təkmilləşdirilməsi yönümündə qurmuşdur. Mövcud olduğu illər ərzində kafedranın əməkdaşları tərəfindən müvafiq sahələr üzrə çoxlu sayda elmi tədqiqatların aparılması və onların nəticələrinin tədris prosesində istifadə olunmasına səy göstərilməsi onu göstərir ki, kafedra qarşısına qoyduğu məqsədlərə nail olmaq istiqamətində əzmkarlıqla çalışır.Kafedra əməkdaşları respublika və beynəlxalq konfranslarda fəal iştirak edirlər. Son illərdə kafedra üzrə 100-dən çox məqalə və tezis, 3 monoqrafiya və 10-dan çox proqram çap olunmuşdur. Bu gün filialımız milli düşüncəli, azərbaycançılıq məfkurəsinə sədaqətli gənclərin tərbiyəsində ən qabaqcıl metod və vasitələrdən istidadə etməklə, yüksək təhsilli pedaqoji kadrların hazırlanması kimi strateji məqsədi əsas götürüb.

Bu gün kollektivimiz möhtərəm Prezidentimiz İlham Əliyevin Azərbaycan təhsilinə, təhsil işçilərinə diqqət və qayğısına cavab olaraq elmdə, təhsildə daha böyük uğurlar qazanmaq üçün gərgin elmi-pedaqoji axtarışlarını inamla davam etdirirlər.

Başda filialın rəhbərliyi olmaqla bütün kollektivimizi yubiley münasibətilə səmimi qəlbdən təbrik edir, Azərbaycanımızın tərəqqisi naminə apardığımız elmi tədqiqat işlərində və ictimai fəaliyyətində bütün kollektivə nailiyyətlər, möhkəm can sağlığı arzulayırıq.

**"Riyaziyyat və kompüter elmləri" kafedrasının müdiri, p.ü.f.d., baş müəllim Mustafayeva Firidə Firudin qızı**



**İlk buraxılış məzunu olduğum doğma təhsil ocağım və məni əmək fəaliyyətimdə də qoynuna alan ADPU-nun Şamaxı filialı.**

Filialımız 30 illik fəaliyyəti dövründə elm və təhsilin inkişafında misilsiz xidmətlər göstərərək qarşısında duran vəzifələri layaqətlə yerinə yetirmiş, yüksək ixtisaslı müəllim hazırlığı işini uğurla həyata keçirmişdir.

ARDI 6-CI SƏHİFƏDƏ

Xalqımızın ümummilli lideri, dünya şöhrətli siyasətçi Heydər Əliyev M.F.Axundov adına Milli kitabxanada çıxış edərkən demişdir: "Kitabxana xalq, millət üçün, cəmiyyət üçün müqəddəs bir yer- mənəviyyat, bilik, zəka mənbəyidir. Ona görə də kitabxanaya daimi hörmət xalqımızın mədəniyyətini nümayiş etdirən amillərdən biridir". Ulu öndər Heydər Əliyevin böyük fəlsəfi mahiyyət kəsb edən bu fikirləri dünya mədəniyyət tarixində kitabxanaya verilən ən müdrik kəlam, böyük elmi və mədəni əhəmiyyətə malik olan fikirlərdir. Ümummilli liderin layiqli davamçısı Prezident İlham Əliyevin "Azərbaycan kitabxanaları xalqımızın milli sərvətidir" kəlamı bu gün dövlətin kitabxana siyasətinin istiqamətverici meyarıdır. Mütəmadi olaraq kitabxana haqqında qəbul edilmiş sərəncamlar, fərmanlar, qərarlar Prezident İlham Əliyevin bu sahəyə olan qayğısının bariz nümunəsidir.

Kitabxana ali məktəbin aparıcı struktur qurumlarından biridir. O təlim-tərbiyə və elmi tədqiqat prosesini tədris, elmi, metodiki ədəbiyyatla, informasiya materialları ilə təmin edərək mənəvi və intellektual əlaqələrin yayılması mərkəzi kimi fəaliyyət göstərir.

Filialın kitabxanası müasir yanaşma və geniş informasiya axınının elmi inkişafa yönəldilməsi, oxucuların mümkün qədər geniş və mütərəqqi informasiya resurslarına çıxış imkanının təmin edilməsi məqsədilə bir sıra yeniliklər həyata keçirib.

Bu gün tələbə və müəllim heyətinin kitaba olan tələbatını ödəmək üçün müvafiq ixtisas kafedralarının sifarişləri əsasında kitab alışı həyata keçirilir və kitabxana fondu yenilənir.

Hal-hazırda kitabxana fondu 31 mindən çox nüsxə ədəbiyyatla təmin olunub. Bunların içərisində 5000 nüsxə dərslik, 4729 dərs vəsaiti, 3441 tədris vəsaiti, 8033 bədii ədəbiyyat (Müasir, dünya ədəbiyyatı), 10574 kitab isə siyasi ədəbiyyatdır. Bundan başqa kitabxanaya abunə olunmuş qəzet və jurnallar da daxil olur. Filialın kitabxanası illər əvvəl internetlə təchiz olunub, bütün mühazirə mətnləri elektron formada kitabxanada yerləşdirilib. Həmçinin təhsilalanlara kitabxana materiallarının onlayn çatdırılması da mümkündür. Filialın kitabxanası mütəmadi olaraq dövlət tədbirlərinin, disput və dəyirmi masaların, yubiley tədbirlərinin keçirilməsini, sərgi və guşələrin təşkil olunmasını diqqət mərkəzində saxlayır.

Kitabxanada müasir e-kitablara, elektron tədqiqat jurnallarına çıxışın yaradılması və beynəlxalq məlumat bazalarından kitabların sifariş edilməsi daim diqqət mərkəzindədir, həmçinin elektron kitabxananın yaradılması sahəsində işlər uğurla davam etdirilir.

30 illik yubiley münasibətilə filialın kollektivini və tələbələrini səmimi qəlbdən təbrik edir, bu şərəfli yolda hər birinə uğurlar, müvəffəqiyyətlər arzu edirəm.

**Kitabxana və elektron resurslar şöbəsinin müdiri Razimi Vəsilə Novruz qızı**



Qədim mədəniyyət və elm mərkəzi olan doğma Şamaxıda yerləşən ADPU-nun Şamaxı filialı 30 illik fəaliyyəti ərzində ölkəmizin təhsil həyatında özünəməxsus rol oynamış və böyük inkişaf yolu keçmişdir. Filialımız bu gün də tələbələrin yüksək səviyyədə təhsil alması, bölgədə savadlı kadrların yetişdirilməsi kimi mühüm vəzifələrin öhdəsindən uğurla gəlir. Filialda 14 illik iş fəaliyyətimə əsaslanaraq deyə bilərəm ki, ADPU-nun Şamaxı filialı mövcud maddi-texniki, tədris bazası və demokratik iş üslubu ilə qloballaşma dövründə rəqabətədavamlı, müasir dünyagörüşlü, vətənpərvər gəncliyin yetişdirilməsinə, yüksək ixtisaslı kadrların fəaliyyətinə, regionun ictimai-siyasi həyatında mühüm rol oynamasına görə cəmiyyətdə müsbət imic qazanmışdır. Bəzən filialda bir ailədən bir neçə övladın təhsil alması bunun bariz nümunəsidir. Keyfiyyət təminatı şöbəsi olaraq, əməkdaşlar, tələbələr, valideynlər, filialın məzunları, təhsil işçiləri arasında apardığımız sorğular da bunu deməyə əsas verir.

Filialın ənənəvi inkişaf strategiyasına əsaslanaraq yeni yaradılan Keyfiyyətin təminatı şöbəsi fəaliyyətinin bütün istiqamətlərində filialın keyfiyyət baxımından yenilənməsinə və inkişafına xidmət edir. Keyfiyyətin artırılması, o cümlədən müəllim və tələbələrin hazırlıq səviyyəsinin artırılmasına yönəlmiş tədbir və təkliflərin hazırlanmasını təmin edir. Şöbə tədris, elm, informasiya-texniki təminat üzrə aidiyyatı strukturlarla qarşılıqlı əməkdaşlıq edir.

1991-ci ildən regionun ilk və tək ali təhsil müəssisəsi olan ADPU-nun Şamaxı filialının bütün kollektivini yubiley münasibətilə təbrik edir, fəaliyyətində bol-bol uğurlar arzulayırıq.

**Keyfiyyət təminatı şöbəsinin mütəxəssisi Sürahi İbadova**



Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin sözləri ilə desək "Peşəkar kadrların hazırlanması bu gün bizim üçün ən başlıca məsələlərdən biridir". Elə buna görə də bu gün Azərbaycanda təhsil ən yüksək səviyyədədir. Bu sahədə həyata keçirilən hər islahat, baş verən hər bir hadisə ilk növbədə Azərbaycanın xoşbəxt gələcəyinə hesablanmışdır. Bu gün qürur hissi ilə deyə bilərik ki, Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şamaxı filialı 30 illik yubileyini təntənə ilə qeyd edir. Fəaliyyətdə olduğu 30 illik müddətdə saysız-hesabsız uğurlar əldə etmişdir. İxtisaslı və savadlı, peşəkar müəllim kadrlarının hazırlanmasında əhəmiyyətli dərəcədə mühüm rol oynamışdır. 1991-ci ildən fəaliiyət göstərən Azərbaycan Dövlət Pedaqoji Unuiversitetinin Şamaxı filialında hazırda struktura müvafiq olaraq 101 nəfər əməkdaş çalışır. Onlardan 12 nəfəri rəhbər və inzibati-idarə, 36 nəfəri professor-müəlim, 32 nəfəri tədris-köməkçi heyətində, 21 nəfəri isə inzibati təsərrüfat şöbəsində çalışır. Professor-müəllim heyətinin 4 nəfəri dosent, 6 nəfəri fəlsəfə doktoru, 6 nəfəri baş müəllim, 20 nəfəri isə müəllimdir. Hazırda professor-müəllim heyətindən 4 nəfər elmlər doktoru, 7 nəfər fəlsəfə doktoru dissertasiya işi üzərində işləyir. İnsan resursları və kargüzarlıq şöbəsinin bir qolu olan kargüzarlıq işləri "Dövlət hakimiyyəti orqanlarında, idarə, təşkilat və müəssisələrində kargüzarlığın aparılmasına dair Təlimat"a əsasən öz işlərini qurur. Filialda professor-müəllim heyəti və tədris-köməkçi heyətinin gəncləşdirilməsi, filial məzunlarının davamlı olaraq doğma təhsil ocağında işə cəlb olunması prioritet məsələlərdəndir. Biz filialımızla fəxr etdiyimiz kimi, onun qürur mənbəyi olan məzunları ilə də öyünürük. Bütün kollektivimizi 30 illik yubileyimiz münasibətilə ürəkdən təbrik edir, gələcək fəaliyyətində uğurlar arzu edirik.

**İnsan resursları və kargüzarlıq şöbəsinin mütəxəssisi Pur-Rza Sevda.**



Hər bir müəssisə və təşkilatın iqtisadi göstəricisinin əsası onun maliyyə -təsərrüfat fəaliyyətindən asılıdır. ADPU-nun Şamaxı filialı bu gün özünü tam maliyyələşmə prinsipilə fəaliyyət göstərir və maliyyə məsələlərində heç bir çətinliklə üzləşmir. Maliyyə hesabatlarının tərtibi mühasibatlıq sənədlərinin əsasında təşəkkül tapır. Məsuliyyətlə deyə bilərik ki, mühasibatlıq hər bir təşkilatın güzgüsüdür. ADPU-nun Şamaxı filialının Mühasibatlıq şöbəsi də peşəkar və məsuliyyətli əməkdaşları ilə hər zaman işini yüksək səviyədə təşkil etmişdir. Xüsusi vurğulamalıyıq ki, işçilərin maddi rifah halının yaxşılaşdırılması daim filial rəhbərliyinin diqqət mərkəzindədir. Odur ki, şöbə olaraq filialın inkişafı üçün əlimizdən gələni edirik. Bizlər də, direktor dosent Tünzalə Yusifova başda olmaqla, bütün filial kollektivini 30 illik yubileyimiz münasibətilə səmimi qəlbdən təbrik edir, inkişaf dinamikasına görə heç də paytaxtda yerləşən ali təhsil müəssisələrindən fərqlənməyən doğma təhsil ocağımıza bol uğurlar arzu edirik!

**Baş mühasib E.M.Əzizov**



Fəaliyyət göstərdiyi müddət ərzində elmi-pedaqoji kadr hazırlanması işini uğurla həyata keçirmiş ADPU-nun Şamaxı filialı hazırda müasir tədqiqatlara əsaslanaraq, innovativ təlim-tədris texnologiyalarından istifadə edərək yüksək mənəviyyata, vətəndaşlıq hislərinə malik Azərbaycan müəllimləri yetişdirir. Filialın İnformasiya və Kommunikasiya Texnologiyaları şöbəsi tədris prosesində yeni texnologiyalardan istifadə olunmasında öz üzərinə düşən vəzifələri layiqincə yerinə yetirir. Filialda keçirilən tədbirlərin filialın rəsmi saytında işıqlanırılması şöbəmiz tərəfindən həyata keçrilir. Bu gün müasir standartlara cavab verən texniki ava`danlıqlarla və davamlı fiberoptik internetlə təchiz olunmuş auditoriyalar tədrisin keyfiyyətinin artmasına xidmət edir. Eyni zamanda şöbə tərəfindənm müəllimlərin İKT sahəsində bacarıqlarının artırılması məqsədilə təlimlər təşkil edilir və dərslərin təşkilinə texniki dəstək göstərilir. Filialın ali təhsil müəssisələrinin informasiya sisteminə (ATİS) qoşulması və məlumatların sistemdə yerləşdirilməsinə də şöbə məsuliyyət daşıyır. Biz də, İnformasiya və Kommunikasiya Texnologiyaları şöbəsiolaraq, ADPU-nun Şamaxı filialının 30 illik tarixi ilə qürur duyur, yeni nailiyyətlərin davamlı olmasını arzu edirik.

**İnformasiya və Kommunikasiya Texnologiyaları şöbəsinin müdir, baş müəllim Rəhimova Mətanət Cümşüd qızı**




Filialımız otuz illik fəaliyyəti dövründə nəinki region,respublikamızın bütün bölgələri üçün savadlı və bacarıqlı müəllim kadrlarının hazırlanmasında mühüm rol oynamışdır. Filialın fəaliyyətə başladığı ildən həmkarlar təşkilatı da yaranmışdır. Filialın inkişaf yolu və qazandığı uğurlarda həmkarlar təşkilatının da yaxından iştirakı və rolu olmuşdur.Həmkarlar İttifaqı Komitəsi olaraq əməkdaşların əmək və sosial hüquqlarının qorunması istiqamətində fəaliyyətimizi qurmuşuq. HİK ilə filialın rəhbərliyi arasında bağlanmış "Kollektiv müqavilə"nin bütün müddəalarının yerinə yetirilməsi uğurla həyata keçirilir.Vaxtaşırı bu maddələr yenilənir, əməkdaşların iş şəraitinin yaxşılaşdırılması, sosial müdafiəsinin gücləndirilməsi, hüquq və mənafelərinin qorunması məsələsinə diqqət yetirilir. Filialda əməkdaşların yubileylərinin keçirilməsi,tarixi gün və bayramların qeyd olunması və onların müxtəlif təltiflərlə mükafatlandırılması ənənə halını almışdır. Filialımızın 30 ildir ki, uğurla fəaliyyət göstərməsi Cənab Prezident İlham Əliyevin düzgün dövlət siyasətinin, regionlara qayğısının təzahürüdür. Biz bu gün böyük fərəh və qürur hissi ilə doğma filialımızın 30 illik yubileyini qeyd edirik.Mən həm 100 illik yubileyini qeyd etdiyimiz ADPU-nun 1979-cu il məzunu olduğum üçün,həm də bu müqəddəs ali təhsil ocağının – Şamaxı filialının artıq 27 ildir ki, əməkdaşı olduğum üçün ikiqat sevinc hissi duyuram. Yubiley münasibəti ilə filialımızın bütün əməkdaşlarını, tələbələrini,məzunlarını səmimi qəlbdən təbrik edirəm!

**ADPU-nun Şamaxı filialı HİK-nin sədri Dadaşov Çingiz Zəbulla oğlu.**



Səndən xəbər alsalar, etsələr xitab
Dünyada ən yaxşı hansıdır kitab?
Cavab ver bu mənim öz kitabımdır
Bu mənim həyatım, öz romanımdır.

Elmi-pedaqoji kadrların hazırlığına əvəzsiz töhfələr verən ADPU -nun Şamaxı filialı 30 il müddətində özünün şərəfli həyat kitabını yazmışdı. Bu kitabı səhifələdikcə görürsən ki, bu illər ərzində öz fəaliyyətini dövrün tələbləri istiqamətində qurmuş, Azərbaycanın mədəni və təhsil həyatında, ziyalı mühitinin formalaşmasında, müəllim kadrların hazırlanmasında əhəmiyyətli rol oynamışdı. Heydər Əliyevin "Bizim bu günkü gəncliyimiz sağlam düşüncəli gənclikdir, vətənpərvər gənclikdir, xalqını, millətini sevən gənclikdir... Gənclərimiz mükəmməl təhsil almalı, həyatı dərindən öyrənməli, dünyada gedən prosesləri bilməlidir. Lazımi fəaliyyət göstərib öz xalqına, dövlətinə xidmət etməlidir." Elm və təhsilin bir biri ilə qarşılıqlı əlaqəsini daima prioritet sahə olduğunu qeyd edən ulu öndər Heydər Əliyev gənclərin də elmə istiqamətləndirilməsini vacib hecab etmişdir. Filialımızda fəaliyyət göstərən Tələbə Elmi Cəmiyyəti öz işini bu tələblər baxımından qurmağa çalışır. Məlumdur ki, tələbələrin elmi-tədqiqat işi tədris prosesinin ən mühüm formalarından biridir. Elmi tədqiqatla məşğul olmaq konkret problemlərin həllinə yaradıcı yanaşma formalaşdırır, məqsədə çatmaq yolunda çətinliklərin öhdəsindən gəlməyi öyrədir, elmi dünyagörüşünü genişləndirir, elmi ədəbiyyatla müstəqil işləmək bacarığını inkişaf etdirir. Bu baxımdan tələbələrimiz ixtisasları, eyni zamanda Ulu öndər irsinin öyrənilməsi istiqamətində elmi-tədqiqat işlərinə cəlb edilirlər. Hər bir təhsil müəssisəsində sağlam psixoloji mühitin mövcudluğu ümumi fəaliyyətə, təhsilin keyfiyyətinə, kollektivdə qarşılıqlı münasibətlərin tənzimlənməsinə müsbət təsir göstərir. Bu məqsədlə filialımızda rəhbərliyin təşəbbüsü və dəstəyi sayəsində "Psixoloji xidmət" kabineti fəaliyyət göstərir. Kabinetdə mütəmadi olaraq pedaqoji kollektiv, tələbələr və əməkdaşlar üçün qrup və fərdi sosial-psixoloji treninqlər, psixoloji konsultasiyalar təşkil edilir.
Bu gün yubiley münasibəti ilə fililalımızın kollektivini təbrik edirəm. Arzu edirəm ki, yüksək milli-əxlaqi dəyərlərə malik müəllim kadrları yetişdirmək işini bundan sonra da şərəflə davam etdirsinlər. Həyat kitabının bundan sonrakı səhifələri filialımızın adını uca tutan məzunların adları ilə, müvəffəqiyyətlərlə, daha böyük uğurlarla, nikbin ruhlu sətirlərlə bol olsun.

**Tələbə Elmi Cəmiyyətinin sədri, baş müəllim p.ü.f.d. Sultanova İhamə Həmid qızı**

## ADPU ŞAMAXI - 30 ŞƏKİLLƏRDƏ



**III beynəlxalq Həmzə Nigari Türk Dünyası mədəni irsi simpoziumunda ADPU-nun rektoru professor Cəfər Cəfərovla filial tələbələri ilə birlikdə**



**Mədəniyyət Nazirliyinin Mədəniyyət üzrə Elmi-Metodiki və İxtisasartırma Mərkəzi ilə ADPU-nun Şamaxı filialı arasında memarandum imzalanarkən**



**"Turan Araşdırma Mərkəzi" (TAM) İctimai Birliyinin "Tarixini unutma!" layihəsi çərçivəsində şəhid türk əsgərinin məzarı önündə tədbirdən**



**AMEA-nın N.Tusi adına Şamaxı Astrofizika Rəsədxanasında elmi seminardan sonra xatirə şəkili**



**Filialda keçirilən "Türkdilli xalqların Elmi-mədəni Əlaqələri müasir mərhələdə: tarixi ənənə və perspektivlər" Respublika elmi konfransından**



**2019-cu ilin "Nəsimi ili" elan olunması ilə bağlı Şamaxı rayon İcra Hakimiyyəti və ADPU-nun Şamaxı filialının birgə təşkil etdiyi tədbirdən**

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ
# ŞAMAXI FİLİALI - 30




## GƏNCLƏR BİZİM GƏLƏCƏYİMİZDİR, SABAHIMIZDIR!
## ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEV.

ADPU-nun Şamaxı filialında tələbələrin yüksək ixtisaslı kadr kimi yetişdirilməsi üçün tədris işinin yüksək səviyyədə qurulması, mədəni-kütləvi tədbirlərin keçirilməsi, tələbələrdə vətənpərvərlik ruhunun gücləndirilməsi, eyni zamanda ölkədə aparılan gənclər siyasətinə dəstəyin nümunəsidir. Bu məqsədlə filialda Tələbə Elmi Cəmiyyəti, Tələbə Gənclər Təşkilatı fəaliyyət göstərir. Filialın tələbə təşkilatları ümumilikdə tələbələrin xüsusi bacarıq və qabiliyyətlərinin aşkar olunması istiqamətində öz işlərini qururlar. Təşkilatlar təqvim və hüzn günləri ilə əlaqədar və eləcə də vətənpərvərlik mövzusunda, Zəfər tariximizin təbliği mövzusundatədbirlərin keçirilməsini daön planda saxlayırlar. Tələbə təşkilatlarının gənclərin mütaliəyə marağının artırılması ilə bağlı müxtəlif elm sahələri üzrə disputların və dəyirmi masaların keçirilməsi, respublikanın görkəmli alim, mütəxəssis, incəsənət xadimləri, müharibə veteranları, milli qəhrəmanları ilə görüşlərin təşkili tələbələr tərəfindən maraqla qarşılanır. Tələbələrin müxtəlif sahələrdə könüllülük fəaliyyətlərinə qoşulmasının təmin edilməsi və onların istiqamətləndirilməsi də tələbə təşkilatlarının fəaliyyət planına daxildir. Onlar eyni zamanda filialda, regionda və eləcə də ADPU-da keçirilən intellektual yarışlara,disput, seminar və təlimlərə qoşularaq uğurlar qazanmışdılar.



**Tələbə Elmi Cəmiyyəti** xətti ilə ali təhsilli mütəxəssis hazırlığının keyfiyyətinin yüksəldilməsi, tələbələrdə yaradıcılıq qabiliyyətinin formalaşdırılması və gücləndirilməsi, istedadlı gənclərin aşkar edilməsi məqsədi ilə tələbələrin elmi-tədqiqat fəaliyyətinə cəlb edilməsi işində filialda böyük diqqət yetirilir. Bu təşkilat istedadlı gənclərin məqsədyönlü şəkildə elmi tədqiqat və elmi-təşkilati işinə cəlb olunması istiqamətində fəaliyyət göstərir. TEC eyni zamanda müxtəlif səviyyəli tədbirlərin - elmi seminar və konfransların keçirilməsində, tələbə elmi işlərinin yerinə yetirilməsində, müxtəlif ixtisas və fənlər üzrə olimpiadaların keçirilməsində tələbələrin iştirakını təmin edir.



**TƏLƏBƏ GƏNCLƏR TƏŞKİLATI** gənclər siyasəti sahəsndə aparılan işlərin əsas hərəkətverici qüvvəsidir. Təşkilatın fəalları nəinki filial daxilində, həmçinin rayon, respublika və beynəlxalq səviyyəli tədbirlərdə də fəal iştirak edirlər və qatıldıqları bütün tədbirlərdən diplom, sertifikat və digər mükafatlarla geri dönürlər.Təşkilatın tərkibində bir sıra departament və klublar fəaliyyət göstərir. Son 5 ildə filial TGT-si 2 dəfə filiallar arasında keçirilən müsabiqədə "İlin TGT-si" mükafatına, təşkilatın sədri isə "İlin təşkilat sədri" nominasiyasına layiq görülüb.



### TƏLƏBƏLƏR PEDAQOJİ TƏCRÜBƏNİ UĞURLA BAŞA VURURLAR

Filialın buraxılış ili tələbələrinin pedaqoji təcrübə keçməsi üçün Şamaxı rayonunun bir neçə qabaqcıl ümumtəhsil və məktəbəqədər təhsil müəssisələri ilə müqavilələr bağlanmışdır.Hər il Tədris planına əsasən 16 fevral-24 may tarixləripedaqoji təcrübə müddəti hesab olunur. Pedaqoji təcrübə prossesində tələbələrin ali təhsil müəssisəsində aldığı nəzəri biliklər təcrübə yolu ilə həyata keçirilir. Filial əməkdaşlarının pedaqoji təcrübənin keçirilməsinə ciddi yanaşmalarının nəticəsidir ki,hər il tələbələr pedaqoji təcrübəni müvəffəqiyyətlə başa vururlar.

Filialın tələbələrinin pedaqoji təcrübə zamanı müasir pedaqoji texnologiyalardan, tədrisdə İKT-nin imkanlarından istifadə etmələrinin nəticəsindətəcrübəni müvəffəqiyyətlə başa vuraraq pedaqoji təcrübə keçirilən müəssisələr tərəfindən müxtəlif təltiflərə layiq görülürlər.

### MƏZUNLARIMIZLA QÜRUR DUYURUQ!

ADPU-nun Şamaxı filialı fəaliyyət göstərdiyi müddətdə regionun yeganə ali təhsil müəssisəsi olaraq həm ixtisaslı kadrların yetişdirilməsində, həm də gənc nəslin vətənpərvər ruhda tərbiyə olunmasında cəmiyyətdə özünə müsbət imic qazanmışdır. Bu gün Şamaxı filialının məzunları öz fəaliyyətləri ilə filialı layiqincə təmsil edirlər. Hər il "Müəllimlərin İşə Qəbulu" (MİQ) imtahanlarında məzunlarımız yüksək nəticələr göstərərək respublikanın müxtəlif bölgələrində pedaqoji fəaliyyətə başlayırlar. Məzunlar arasında tanınmış elm adamları, təhsilin bütün pillələrindən olan müəssisələrdə müəllim və rəhbər işçilər, bundan başqa müxtəlif dövlət və özəl qurumlarda çalışanlar var. Məzunlarla mütəmadi təşkil olunan görüşlərdən də məlum olur ki, bir ali təhsil müəssisəsinin fəaliyyəti onun məzunlarının gələcək fəaliyyəti üçün mayak rolunu oynayır.

### ZƏFƏR YOLU UĞRUNDA



Ali Baş Komandanımız cənab İlham Əliyevin rəhbərliyi ilə işğal altında qalan torpaqlarımızın azad edilməsi və ölkəmizin ərazi bütövlüyünün təmin edilməsi ilə başa çatan Vətən müharibəsi ADPU-nun Şamaxı filialının kollektivi tərəfindən böyük qürur hissi ilə dəstəkləndi.

Bu şanlı tarixə filialın məzunları da öz imzalarını atdılar. Onlar arasında 2011-ci il məzunumuz Elgün Əzizov Füzuli istiqamətində gedən döyüşlərdə şəhid olaraq "Vətən uğrunda", "Füzulinin azad olunmasına görə", "Xocavəndin azad olunmasına görə" medalları ilə, 2016-cı il məzunumuz Orxan Nəbiyev isə Suqovuşan yüksəkliklərində gedən döyüşlərdə şəhid olaraq "Vətən uğrunda", "Döyüşdə fərqlənməyə görə", "Suqovuşanın azad olunmasına görə" medalları, "Azərbaycan bayrağı" ordeni ilə təltif olunmuşdular.

Eyni zamanda məzunlarımızdanƏmirxan Nəbiyev, Ülvi Fərəcov, Rəmzi Məmmədov, Ramiz Nuriyev, Fuad Rəcəbov, Qəribov Musa, İmanlı Əlpənah, Əliyar Sadıqov, Rasim Hüseynzadə, İlkin İsmayılov, Alı Sərdarov, Məhəbbət Orucov, Seyidmiri Məhəmmədov, Əmrah Mustafayev, Mövlan Nərmanov, Rəsulov Ümüd, Qurban Mürsəlov, Nicat Məmmədov Vətən müharibəsində əsl vətənpərvər göstərərək vuruşmuşdular. Onlar da Ali Baş Komandan tərəfindən orden və medallarla təltif olunmuşdular.

44 günlük Vətən Müharibəsi zamanı ön cəbhəyə göstərdiyi xüsusi dəstəyə görə ADPU-nun Şamaxı filialı Azərbaycan Respublikası Səfərbərlik və Hərbi Xidmətə Çağırış üzrə Dövlət Xidmətivə Vətən Müharibəsi Veteranları İctimai Birliyitərəfindən Fəxri Fərmanla təltif olunmuşdur.

Filialın 30 illik fəaliyyətinin bir hissəsini əks etdirərək bildirmək istəyərdik ki, filialda tələbələrin yalnız yüksək təhsilə yiyələnmələri üçün asudə vaxtlarının səmərəli təşkili və maraqlı tələbə həyatının qurulması ilə bağlı səmərəli fəaliyyətin görülməsi daim ön planda olmuşdur. Onların qatıldıqları təlimlərdən, layihələrdən, intellektual yarışlardan qalibiyyətlə dönmələri bunu bir daha təsdiqləyə bilər. Əminliklə deyə bilərik ki, filial zəngin təcrübəsinə əsaslanaraq öz fəaliyyətini bundan sonra da müasir innovativ tədris prosesinin qurulması, gənc nəslin dövlətə və dövlətçiliyə sadiq, vətənpərvər ruhda tərbiyə olunması istiqamətində quracaqdır. Bu yolda filialın bütün əməkdaşlarına və tələbə həyatına uğurlar arzu edirik.


## Redaksiya heyəti


Professor Cəfər Cəfərov
Müşahidə şurasının sədri


Professor Fikrət Rzayev
Müşahidə Şurasının üzvü


Dosent Tünzalə Yusifova
Şamaxı filialının direktoru


f.d. Mikayılov Şasəddin
Şamaxı filialının direktor müavini


Seyidova Şəlalə
Şamaxı filialının direktor müavini


Yaqubov Şamo
Şamaxı filialının İKT şöbəsinin mütəxəssisi


Cavid Hüseynov
Redaktor


Taleh Mirzəyev
Redaktor


Asim İbrahimov
Redaktor


Elvin Vahidov
Dizayner

Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı"nda çap olunub. Sifariş №: 1456

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.